© *“Metafizika” Journal* *p-ISSN 2616-6879*
*Vol 6, issue 1, serial 21, 2023. pp.121-131* *e-ISSN 2617-751X*

**UOT: 327**
**KBT:** 66.4
**MJ №** 158

# Heydər Əliyev və müasir Azərbaycan Respublikasının xarici siyasətinin formalaşması

**Zümrüd Məlikova***

**Abstrakt.** Məqalədə Ümumilli lider Heydər Əliyevin fəaliyyətinin müasir Azərbaycan Respublikasının xarici siyasətinin formalaşmasına təsiri tədqiq edilmişdir.

Araşdırmada Azərbaycanın müstəqillik əldə etdikdən sonra qarşılaşdığı problemlər, Heydər Əliyev hakimiyyətə gəldikdən sonra Ermənistanla müharibə şəraitində dövlət və ordu quruculuğu məsələləri, xarici siyasət prioritetlərinin müəyyənləşdirilməsi məsələləri əks edilmişdir. Bundan əlavə müasir Azərbaycan Respublikasının xarici siyasətinin əsas istiqamətləri, ikitərəfli və çoxtərəfli formatda əməkdaşlıq əlaqələrinin formalaşmasındakı Heydər Əliyevin tarixi rolu şərhə cəlb edilmiş və müvafiq qənaətlər təqdim edilmişdir.

**Açar sözlər:** Azərbaycan Respublikası, xarici siyasət, “yumşaq güc” siyasəti, siyasi islahatlar

## 1.Giriş

*“Heydər Əliyev Azərbaycanın böyük lideri idi. O, böhranlar dövründə öz ölkəsinə sabitlik gətirdi. Azərbaycan xalqı onun qoyduğu irslə fəxr edə bilər”. Fransanın keçmiş prezidenti Jak Şirak*

Azərbaycan qədim, şərəfli dövlətçilik tarixi və irsinə, varislik ənənələrinə malikdir. Azərbaycanın zəngin dövlətçilik ənənələri qədim olub e.ə. III minillikdən başlayıb eramızın III minilliyində də davam etməkdədir. Mühüm coğrafi regionda yerləşən Azərbaycan geosiyasi əhəmiyyəti baxımından tarixən bir çox dövlət və imperiyaların maraq dairəsində olub.

* Siyasi elmlər üzrə fəlsəfə doktoru;
Bakı Slavyan Universitetinin dosenti; Bakı, Azərbaycan
E-mail: zumrud.melik@gmail.com
https://orcid.org/0000-0001-5943-0441

**Məqaləyə istinad:** Məlikova, Z. [2023]. Heydər Əliyev və müasir Azərbaycan Respublikasının xarici siyasətinin formalaşması. *“Metafizika” jurnalı, 6(1),* səh.121-131.

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 13.01.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 10.02.2023*
*Çapa qəbul edilmişdir: 13.03.2023*

Son orta əsrlər və sonrakı dövrdə Osmanlı imperiyası ilə İran arasında, XVIII əsrdən isə beynəlxalq münasibətlərdə aktiv müstəmləkə siyasətinə başlayan Rusiya imperiyasının Qafqaz siyasətində vacib əhəmiyyət kəsb edib. 200 ilədək Rusiya imperiyasının, 70 ilədək Sovet imperiyasının tərkibində müstəqilliyini itirən və itismar olunan Azərbaycan xarici siyasət yeritmək imkanından məhrum olmuşdu.

1980-ci illərin ikinci yarısında SSRİ-də mərkəzi hakimiyyətin zəifləməsi, mərkəzdənqaçma meyllərinin artması, sovet hakimiyyətinin "yenidənqurma", "aşkarlıq" siyasəti, senzuranın ləğvi, siyasi partiyaların fəaliyyətinə məhdudiyyətlərin aradan qalxması və s. səbəblərdən ötən əsrin sonlarında dünyanın ikinci fövqəldövlətində ideoloji, siyasi və iqtisadi vəziyyət böhran həddinə çatdı. Sovet lideri M.Qorbaçovun Qərblə əməkdaşlıq etməyə yönəlik siyasəti sosialist düşərgəsinin dağılmasına, Şərqi Avropanın sosialist ölkələrinin qısa zamanda Qərbə inteqrasiyasına, SSRİ-nin isə sürətlə parçalanmasına gətirib çıxardı. İmperiyanın siyasi beyin mərkəzi sovet hərb maşınının köməyi ilə müxtəlif bölgələrdə, o cümlədən, Bakıda qanlı qırğınlar törətməklə SSRİ-yə süni nəfəs verməyə çalışsa da, bu qarşısıalınmaz prosesi dayandırmaq mümkün olmadı və SSRİ süqut etdi.

Yaranmış tarixi şərait nəticəsində 1991-ci il oktyabrın 18-də Azərbaycan Ali Sovetinin sessiyasında tarixi sənəd-Dövlət Müstəqilliyi haqqında Konstitusiya Aktı qəbul edildi. Konstitusiya Aktının II maddəsində müstəqil Azərbaycan Respublikasının 1918-1920-ci illərdə mövcud olmuş Azərbaycan Demokratik Respublikasının hüquqi varisi olduğu qeyd olundu [1].

**2.Heydər Əliyev və Azərbaycanın əsas xarici siyasət vəzifələri**

Müstəqilliyinin ilk illərində Azərbaycan Respublikası bir sıra problemlərlə üzləşdi. Bunlar:

-Zorla cəlb olunduğumuz müharibədə bir sıra torpaqlarımız Ermənistan tərəfindən işğal olunması;
-İqtisadi çətinliklər;
-Bir milyondan çox qaçqın və məcburi köçkünlərin problemləri;
-Daxili qeyri-sabitlik və siyasi separatizmin güclənməsi;
-Beynəlxalq aləmdə təcrid vəziyyətində olmaq və informasiya blokadası;
-Dünya birliyinin qeyri ədalətli münasibəti;
-Hakimiyyət böhranı və s.

Belə gərgin və müstəqilliyimiz üçün həlledici şəraitdə, I Qarabağ müharibəsinin aktiv fazasında daxili qeyri-sabitliyin artması Azərbaycanın gələcəyini sual altına qoydu. Belə ki, 1993-cü ilin yayında kəskinləşən hakimiyyət böhranı nəticəsində Azərbaycan dövlətçiliyi üçün təhlükə yarandı. Bu dövrdə daxildə qanunsuz hərbi qruplaşmalar xaricdən aldıqları

dəstək sayəsində Azərbaycanın müstəqilliyinə və suverenliyinə ciddi ziyanlar vurmaq yolunu seçdilər. Bir-birinin ardınca dövlət çevrilişinə cəhdlər oldu. Ermənistanın Azərbaycana təcavüzünün davam etdiyi, siyasi separatizmin genişləndiyi bir dövrdə hakimiyyətə gələn Heydər Əliyevin qarşısında mühüm və taleyüklü vəzifələr durdu. Heydər Əliyevin Azərbaycan rəhbərliyinə qayıdışı ilə ölkənin ictimai-siyasi, sosial, iqtisadi, elmi-mədəni həyatında, beynəlxalq əlaqələrində dönüş yarandı, demokratik əsaslara, beynəlxalq norma və prinsiplərə uyğun müstəqil dövlət quruculuğu prosesi başlandı.

Heydər Əliyev dövlət başçısı kimi ilk növbədə, Azərbaycan dövlətçiliyinin, siyasi idarəçiliyin möhkəmləndirilməsinə və sabitliyin təmin olunması istiqamətində fəaliyyətini genişləndirdi. Bu dövr haqda Heydər Əliyev deyirdi:

*“Respublikamızın qarşısında duran əsas vəzifələrdən biri Azərbaycanın mənafeyini dünya miqyasında müdafiə edə bilən ağıllı, səriştəli xarici siyasətin yeridilməsidir. Qarşıda böyük vəzifələr durur. Bizim xarici siyasətimiz birinci növbədə Azərbaycanın dövlət müstəqilliyini təmin etməyə yönəldilməlidir”*.[2]

Heydər Əliyev qarşısında duran vəzifələri həll etmək üçün yalnız siyasi-diplomatik üsula üstünlük verib danışıqlar, diplomatiya yolunu seçdi və mahir diplomatiyası və yüksək peşəkarlığı sayəsində onları həll edə bildi. O, cəmiyyətimizin fərqli cəhətlərini nəzərə alaraq gələcəkdə milli və dini qarşıdurmanın yaranmasına imkan vermədi. Xarici düşmənlərin bundan yararlanmaq imkanının qarşısını aldı, Azərbaycanı bölməyə çalışan daxili və xarici qüvvələri neytrallaşdırdı. Azərbaycanın siyasi səhnəsində diplomatik fəaliyyət mədəniyyətinin yerini möhkəmləndirdi və özündən sonrakı siyasətçilərə nümunə oldu. Heydər Əliyev bu kimi gedişlərlə faktiki olaraq Azərbaycan xarici siyasətinin ümumi cizgilərini və əsas metodlarını yaratdı. O, daxili problemləri həll etmək üçün tətbiq etdiyi siyasi və diplomatik məharətə əsaslanan üsulları xarici siyasi fəaliyyətə proyeksiya etdi. “Balanslaşmış xarici siyasət kursu”nun əsası məhz Heydər Əliyev hakimiyyətinin əvvəllərində formalaşdı.

Hələ Milli Məclisin sədri seçilərkən Heydər Əliyev xarici siyasətin başlıca vəzifələrini və istiqamətlərini müəyyənləşdirdi:

*“Azərbaycanın müstəqilliyini təmin edən atributlardan biri xarici siyasətdir, Azərbaycanın sağlam xarici siyasəti olmalıdır, düşünülmüş xarici siyasəti olmalıdır, uzaqgörən xarici siyasəti olmalıdır, elə xarici siyasəti olmalıdır ki, Azərbaycanı dünya dövlətləri birliyinə bağlasın, Azərbaycanın bütün dövlətlərlə əlaqəsini, Azərbaycanın mənafeyini təmin*

*etsin və Azərbaycanı de-fakto dünya miqyasında bir müstəqil dövlət kimi tanıtmağı təmin edə bilsin. Azərbaycanın indiyə qədər belə sağlam düşüncəli xarici siyasəti olmayıbdır".*[4,5]

Ölkənin mənafelərini qorumaq istiqamətində hərtərəfli ölçülüb-biçilmiş addımların atılmasının vacibliyini vurğulayan Heydər Əliyev Azərbaycanın dövlətçilik mənafelərini hər şeydən uca tutaraq müxtəlif dövlətlərin bütövlükdə Qafqaz və bilavasitə ölkəmiz üzərində qurulmuş iqtisadi maraq və nüfuz dairəsi uğrunda mübarizələrini nəzərə alaraq, çevik manevrlər və xüsusi taktiki gedişlər etdi. Xarici siyasət kursunda mövcud reallıqları nəzərə alan və ölkənin mənafelərinin qorunmasına yönəlmiş əməli dəyişikliklər edildi. Müstəqil Azərbaycan dövlətinin beynəlxalq münasibətlər sistemində yeri, Avropa ölkələri və ABŞ-la, postsovet ölkələri və Rusiya ilə, türkdilli dövlətlər və Türkiyə, müsəlman dünyası və İranla, nüfuzlu beynəlxalq təşkilatlarla əlaqələrinin yaxın dövr üçün prioritetləri müəyyənləşdirildi və tədricən həyata keçirilməyə başlandı.

**3.Müstəqilliyimizin ilk illərində dövlət quruculuğu**

Hüquqi dövlət quruculuğuna xüsusi önəm verən Heydər Əliyev müstəqil Azərbaycan Respublikasının Konstitusiyasının hazırlanmasını birinci dərəcəli vəzifə hesab edirdi.1995-ci ilin noyabrında referendum yolu ilə Azərbaycan Respublikasının ümumbəşəri demokratik dəyərləri özündə əks etdirən Konstitusiyasının qəbul edilməsi, 1995 və 2000-ci illərdə çoxpartiyalılıq əsasında demokratik parlament seçkilərinin keçirilməsi, Konstitusiya Məhkəməsinin fəaliyyətə başlaması, Azərbaycanda ölüm cəzasının ləğv olunması və bir sıra digər qanunların qəbulu və həyata keçirilməsi məhz Heydər Əliyevin adı ilə bağlıdır.

Heydər Əliyev elm və təhsilin inkişaf etdirilməsinə xüsusi diqqət ayırmış və dəstək vermişdir. Onun təşəbbüsü və dəstəyi ilə yüzlərlə gənc dövlət hesabına təhsil almaq üçün xarici ölkələrə göndərildi və bu gün onlar cəmiyyətimizin müxtəlif sahələrində çalışıb öz bilik və bacarıqları ilə Vətənə xidmət edirlər. Heydər Əlyevin təşəbbüsü, bilavasitə rəhbərliyi ilə 2001-ci il noyabrın 9-10-da dünya azərbaycanlılarının Bakıda keçirilən I qurultayı Azərbaycan diasporunun fəaliyyətinin yaxşılaşdırılması və gücləndirilməsi sahəsində çox dəyərli tarixi qərarlar qəbul etdi. Dünya azərbaycanlılarının təşkilatlanması sahəsində bu mühüm bir addım oldu. Heydər Əliyev hesab edirdi ki, dünya azərbaycanlıları müstəqil Azərbaycan Respublikasının beynəlxalq aləmlə münasibətlərinin inkişafında, ölkəmiz haqqında həqiqətlərin dünya ictimaiyyətinə çatdırılmasında iştirak etmək imkanına malik ən fəal qüvvəyə çevrilməlidir. Diaspor quruculuğunun ən vacib istiqamətlərindən biri də məhz soydaşlarımızın tarixi Vətənin maraqlarından

irəli gələn bu prosesdə daha fəal iştirakını təmin etməkdir. Əsası Heydər Əliyev tərəfindən qoyulan bu siyasət real nəticələrini verməkdədir.

Heydər Əliyev Azərbaycanın ərazi bütövlüyünün bərpa edilməsi yolunda ilk olaraq xalq-iqtidar birliyinə, etniklərarası harmonik əlaqələrə və daxili sabitliyə nail olmağa çalışdı. Ulu öndər Heydər Əliyevin formalaşdırdığı milli ideologiya, Azərbaycançılıq məfkurəsi ölkəmizdə tam bərqərar oldu, Azərbaycan xalqı vahid milli ideya ətrafında birləşib çox uğurlu inkişaf yolu keçdi. Hal-hazırda Azərbaycanda dinlərarası, millətlərarası münasibətlər nümunəvi xarakterə malikdir. Azərbaycanda bütün xalqların, dinlərin nümayəndələri bir ailə kimi mehribanlıq şəraitində yaşayır. Keçən dövr ərzində ölkə daxilində dinlərarası, millətlərarası münasibətlərin tənzimlənməsində çox böyük uğurlara nail olunmuşdur. Müasir dövrdə islamofobiya, ksenofobiya, ayrı-seçkilik artıq bəzi ölkələrdə dövlət siyasətinə çevrilib, başqa millətlərin, dinlərin nümayəndələrinə mənfi münasibət göstərilir. Azərbaycan xalqı öz milli mənəvi dəyərlərinə sadiq qalıb nümunəvi multikultural bir cəmiyyət modeli formalaşdırıb. Bu siyasətin nəticəsi kimi II Qarabağ müharibəsi dövründə dini, etnik mənsubiyyətindən asılı olmayaraq bütün Azərbaycan vətəndaşlarının dövlətimizin ərazi bütövlüyünün bərpası yolunda aparılan hərbi əməliyyatlarda iştirak etməsini, bütün milli və dini icmaların vahid bir cəbhədə birləşərək həm ön cəbhədə, həm də arxa cəbhədə birgə mübarizəsini göstərə bilərik. Erməni lobbi təşkilatlarının Azərbaycana qarşı apardığı kampaniyalar, ölkəmizdə vətəndaş qarşıdurmasına, dini və etnik dözümsüzlük şəraitini yaratmağa yönəlmiş səyləri uğur qazanmadı. Ermənistan tərəfindən işğal olunmuş torpaqlarımızın azad olunması və Qarabağda formalaşan terror qruplaşmalarını darmadağın etmək məqsədilə aparılan “Dəmir Yumruq” əməliyyatı zamanı müzəffər Azərbaycan Ordusunun sıralarında bütün xalqların nümayəndələri çiyin-çiyinə, qələbəyədək vuruşması Heydər Əliyevin əsasını qoyduğu və Prezident İlham Əliyevin davam etdirdiyi milli siyasətin böyük uğuru idi.

**4.İkitərəfli və çoxtərəfli formatda əməkdaşlıq istiqamətləri**

Heydər Əliyev Azərbaycanın müsbət beynəlxalq imicinin formalaşdırılması, Azərbaycan tarixinin, mədəniyyətinin, incəsənətinin və həqiqətlərinin tanıdılması sahəsində təbliğata xüsusi önəm vermişdir. Heydər Əliyev öz diplomatiyasında müasir beynəlxalq münasibətlərdə əsas rol oynayan “yumşaq güc” (ing.“soft power”) siyasətinə geniş yer vermişdir. Onun bu siyasəti bu gün də uğurla davam etdirilir. Bu gün Azərbaycanın xarici siyasi, iqtisadi, mədəni və humanitar sahədə beynəlxalq əlaqələri geniş şaxəli olub yüksələn xətt üzrə inkişaf edir. Bu sahədə Heydər Əliyev Fondunun fəaliyyəti təqdirəlayiqdir. Ölkəmizdə Avroviziya musiqi

yarışmasının (2012), I Avropa Oyunları (2015), IV İslam Həmrəylik Oyunları (2017), Bakı Beynəlxalq Humanitar Forumları (2011-ci ildən keçirilir) və digər beynəlxalq tədbirlərin keçirilməsi Azərbaycan tarixinin, mədəniyyətinin və həqiqətlərinin tanıdılması və işgüzar əlaqələrinin genişləndirilməsinə mühüm təsir göstərir.

Müstəqilliyin ilk illərində Azərbaycan həqiqətlərinin dünya birliyinə çatdırmaq və informasiya blokadasını qırmaq üçün Heydər Əliyev diplomatik fəaliyyətini ardıcıl davam etdirdi və hakimiyyəti illərində buna nail oldu. Onun layiqli davamçısı İlham Əliyev bu sahədə beynəlxalq aləmdə böyük uğurlara imza atıb. Məqsədyönlü və ardıcıl diplomatik fəaliyyət, əldə edilmiş nəticələr, qəbul edilmiş qərarlar bunu bir daha təsdiqləyir. Bunun bariz nümunəsi Azərbaycanın 155 ölkənin dəstəyi ilə BMT Təhlükəsizlik Şurasının qeyri daimi üzvü seçilməyi oldu. Gənc, müstəqil dövlət üçün bu böyük nailiyyət olub dünyadakı mövqelərimizin möhkəmlənməsinə xidmət edir. Bu gün Azərbaycan çox müsbət beynəlxalq reputasiyaya malik, qalib bir ölkədir.

Heydər Əliyev xarici siyasətdə Azərbaycanın ikitərəfli və çoxtərəfli müstəvidə beynəlxalq əlaqələrinin genişləndirilməsi, beynəlxalq və regional təşkilatlarla əməkdaşlığına xüsusi önəm verdi. Heydər Əliyevin hakimiyyəti illərində Azərbaycan Respublikası NATO-nun SNT Proqramına, Avropa İttifaqının AQS-yə qoşulmuş, Avropa Şurasına üzv qəbul olundu. Heydər Əliyev BMT, ATƏT, İKT (təşkilat hal-hazırda İƏT adlanır), NATO kimi beynəlxalq və regional təşkilatların sammitlərində, görüşlərində iştirak edib bu təşkilatların yüksək kürsülərdən Azərbaycan həqiqətlərini duyurmuş və öz prinsipial mövqeyini bildirmişdir.

Heydər Əliyevin xarici siyasətinin əsas vəzifələrindən biri ikitərəfli əlaqələr idi. Böyük siyasətçi Heydər Əliyev qlobal səviyyədə geosiyasi mühitin Qərbin xeyrinə kəskin dəyişdiyi reallığını qəbul etsə də, Rusiya ilə əlaqələri kəsməyin çox təhlükəli və tarixi gerçəklik baxımından perspektivsiz olduğunu başa düşürdü. O, dil, din yaxınlığı və tarixi keçmiş nəzərindən Türkiyə ilə bölgədə strateji tərəfdaşlıq əlaqələrinin qurulması tərəfdarı idi. İranın qonşu olması, 30 milyon soydaşımızın bu ölkədə yaşaması və ortaq tarixə malik olduğumuz cəmiyyət kimi xarici siyasətdə vacib yer almalı olduğunu bilirdi. İranla əməkdaşlıq xətti uzaqgörən siyasətçi Heydər Əliyev tərəfindən dəstəkləndi. Qərblə hərtərəfli əlaqələrin qurulması Heydər Əliyev xarici siyasətinin aparıcı xətti kimi müəyyənləşdi.

Heydər Əliyev Azərbaycanın regionda olan digər dövlətlərə yönəlik xarici siyasət kursunu da müəyyənləşdirdi. Azərbaycan qonşu dövlətlərlə daha da sıx münasibətlər qurmağa nail olub ikitərəfli münasibətləri ən yüksək səviyyəyə qaldıra bilmişdir. Heydər Əliyevin qonşu ölkələrlə qurduğu

ikitərəfli əlaqələrin möhkəm bazaya malik olması, qarşılıqlı maraq və mənafelərin üst-üstə düşməsi əməkdaşlıq münasibətlərinin bu gün də qorunub saxlanılmasını təmin edir. Vətən müharibəsi dövründə Gürcüstanın Ermənistanla sərhədlərini bağlaması, Rusiya və İranın mövqeyi bunu deməyə əsas verir.

Heydər Əliyevin xarici siyasətində əsas vəzifələrindən biri ölkənin pozulmuş ərazi bütövlüyünü təmin etmək idi. Ermənistanın Azərbaycana təcavüzü və I Qarabağ müharibəsinin aktiv fazasında ordu quruculuğu ilə yanaşı, ərazilərimizin müdafiəsi məsələsinə xüsusi diqqət ayrıldı və cəbhə xəttində atəşkəs elan edilməsinə nail olundu.

Heydər Əliyevin müəyyənləşdirdiyi siyasi kursu davam etdirən Prezident İlham Əliyev Azərbaycanın beynəlxalq təşkilatlar çərçivəsində fəal iştirakı üçün möhkəm siyasi iradə nümayiş etdirib bir sıra uğurlara nail oldu. Beynəlxalq təşkilatlar Dağlıq Qarabağ münaqişəsinin həlli ilə bağlı bizim ədalətli mövqeyimizi dəstəkləyib Dağlıq Qarabağı Azərbaycanın tərkib hissəsi kimi tanıdı. Beynəlxalq təşkilatların qəbul etdiyi qətnamələr və sənədlərdə münaqişənin ölkəmizin ərazi bütövlüyü çərçivəsində öz həllini tapmalı olduğu vurğulandı. BMT-nin Baş Məclisi, Qoşulmama Hərəkatı, İslam Əməkdaşlıq Təşkilatı, Avropa Şurası Parlament Assambleyası, Avropa Parlamenti, İqtisadi Əməkdaşlıq Təşkilatı və digər təşkilatlar münaqişə ilə bağlı bizim mövqeyimizi dəstəkləyən qətnamələr qəbul etdi. Vətən müharibəsi ərzində beynəlxalq təşkilatların mövqeyi dəyişmədi, bu Heydər Əliyevin əsasını qoyduğu xarici siyasət kursunun onun xələfləri tərəfindən aktiv və səmərəli davam etdirilməsinin nəticəsi idi.

Beləliklə, Ümummilli lider Heydər Əliyevin müəyyənləşdirdiyi Azərbaycan xarici siyasət kursu və xarici siyasət prioritetləri Dağlıq Qarabağ münaqişəsinin həlli istiqamətində apardığı məqsədyönlü, gərgin və prinsipial siyasi-diplomatik fəaliyyəti təqdirəlayiqdir. Heydər Əliyev daim beynəlxalq tribunalarda, panellərdə və debatlarda haqlı mövqeyimizi tarixi, siyasi, hüquqi arqumentlərlə əsaslandıraraq Ermənistanın təcavüzkar dövlət kimi tanınması yolunda ardıcıl siyasətini daim davam etdirdi.

Heydər Əliyevin I Qarabağ müharibəsindən sonra ordu quruculuğu ilə bağlı apardığı siyasət təqdirəlayiqdir. Ordunun texniki təchizatı və kadr resursları yaxşılaşdırılması prosesi Heydər Əliyev dövründə başlandı. Hərbi kadrların yetişdirilməsi və ordunun peşəkarlığının artırılması məqsədilə azərbaycanlı gənclər Türkiyənin hərbi məktəb və akademiyalarına hərbi təhsil üçün göndərildi. Onların bir çoxu II Qarabağ müharibəsində Vətənə xidmətlərini yüksək səviyyədə yerinə yetirdilər. Əsası Heydər Əliyev dövründə qoyulan ordu quruculuğu siyasəti real nəticələrini bu gün

verməkdədir. Azərbaycan Ordusu dünya miqyasında güclü ordular sırasında, təchizat, silah-sursat, texnika və döyüş qabiliyyəti baxımından qabaqcıl ordulardan olduğunu Vətən müharibəsində Ermənistan silahlı qüvvələrinə qarşı apardığı hərbi əməliyyatlarda göstərdi. Beynəlxalq ictimaiyyət hərbçilərimizin psixoloji hazırlığı, vətənpərvərlik hissini əyani olaraq gördü. Beləliklə, Azərbaycanın müdafiəyə ayırdığı xərclər özünü tam doğrultdu.

ABŞ-ın müstəqil "Qlobal Firepower" təşkilatının 2023-cü il hesabatına görə, Azərbaycan Silahlı Qüvvələri 145 ölkə arasında 57-ci, Cənubi Qafqazda isə ən güclü və hazırlıqlı ordudur (Gürcüstan 85-ci, Ermənistan isə 94-cü yerdədir). Azərbaycan tank, reaktiv yaylım atəş sistemi və özüyeriyən artilleriya qurğularının sayına görə dünya ölkələri arasında 30-cu yerdədir. "Global Firepower"in qiymətləndirmələrinə görə, Bakının 920 tankı (25-ci yer), 323 reaktiv yaylım atəş sistemi (18-ci yer) və 167 özüyeriyən artilleriya qurğusu (28-ci yer) var [3].

Azərbaycanın xarici siyasətinin böyük uğurlarından biri Heydər Əliyev dövründə onun gərgin siyasi-diplomatik fəaliyyəti nəticəsində imzalanmış "Əsrin Müqaviləsi" hesab olunur. "Əsrin Müqaviləsi" 1994-cü il sentyabrın 20-də Bakıda "Xəzər dənizinin Azərbaycan sektorunda "Azəri", "Çıraq" yataqlarının dərinlikdə yerləşən hissəsinin birgə işlənməsi və hasil olunan neftin pay şəklində bölüşdürülməsi" haqqında dünyanın 11 ən iri neft şirkəti ilə imzalandı. Bununla da, Azərbaycanın neft strategiyasının əsası qoyuldu. Həmin illərdə neft müqavilələri sahəsində danışıqlar prosesinə o zaman ARDNŞ-in birinci vitse-prezidenti olan İlham Əliyev rəhbərlik edirdi. Sonralar bu haqda İlham Əliyev deyirdi:

> *"...neft müqavilələrini imzalayarkən mən, ilk növbədə, geosiyasi məsələləri qaldırır, yalnız bu sahədə anlaşma əldə olunandan sonra texniki-iqtisadi problemlərin təhlilinə keçir, hər bir məsələni konkretləşdirməyə başlayırdım"* [2].

Azərbaycan rəhbərliyinin bu gedişləri yalnız taktiki xarakter daşımırdı. Bəlkə də həmin dövr üçün mühüm əhəmiyyəti olan maliyyə gəlirindən çox, gələcək üçün prinsipial məna kəsb edən tərəfdaş kimi etimad qazanmaq daha önəmli idi. Azərbaycan həmin illərdə peşəkar diplomatik və siyasi-iqtisadi gedişləri ilə etibarlı tərəfdaş imicini qazandı. Enerji faktorunu xarici siyasətin aktual məsələsinə çevirməklə Azərbaycan özünün təhlükəsizliyini regional və beynəlxalq təhlükəsizlik sistemi ilə sıx əlaqələndirirdi. Azərbaycan enerji amilini xarici siyasətinin əsas elementlərindən birinə çevirməklə regional və qlobal səviyyədə cərəyan edən geosiyasi və geoiqtisadi proseslərin mahiyyətini dəqiq qiymətləndirdiyini sübuta yetirdi. Bu məqam indi də xarici siyasətdə güclü bir vasitə kimi öz pozitiv rolunu oynamaqdadır.

Heydər Əliyevin neft strategiyası əsasında Prezident İlham Əliyevin dövründə bir sıra böyük regional layihələrə başlanıldı. Avropanın, Avrasiyanın enerji xəritəsini dəyişdirməyi hədəfləyən Azərbaycan bundan sonrakı illər ərzində Avrasiyada çox önəmli enerji resurslarını dünya bazarlarına çıxaran ölkə kimi fəaliyyət göstərəcəkdir. Bundan əlavə, nəqliyyat infrastrukturunun yeniləşməsi, yaradılması, eyni zamanda, qonşularla əməkdaşlıq edərək regional infrastruktur da yaradıldı. Bakı-Tbilisi-Qars dəmir yolunun açılışı növbəti tarixi nailiyyət idi. İstifadəyə verilən bu tarixi yol bizim geosiyasi mövqeymizi möhkəmləndirir. Hal-hazırda Azərbaycan ərazisindən yüklərin daşınması gündən-günə artmaqdadır. Bununla paralel olaraq, hazırda Şimal-Cənub nəqliyyat dəhlizinin yaradılması nəzərdə tutulur. Beləliklə, açıq dənizlərə çıxışı olmayan ölkə olan Azərbaycan Avrasiyanın nəqliyyat mərkəzlərindən birinə çevrilir.

Beləliklə, Azərbaycan Respublikası 1993-cü ilin ikinci yarısından xarici siyasətini sistemli, düşünülmüş və ardıcıl olaraq aparmağa nail oldu. Ulu öndər Heydər Əliyevin konturlarını müəyyənləşdirdiyi mükəmməl xarici siyasət kursunu İlham Əliyev güclü siyasi iradəsi, mahir diplomatik bacarığı ilə uğurla davam etdirir. Müstəqilliyimizin 31 ili ərzində toplanan təcrübə sübut edir ki, ölkəmizin xarici siyasət kursu böhranlı vəziyyətlərdə də səmərəlidir.

## 5.Nəticə

Nəticə etibarilə, Azərbaycanın xarici siyasəti XXI əsrə qlobal miqyasda baş verən geosiyasi proseslərə, regional vəziyyətə və dünyanın enerji təhlükəsizliyi sisteminin qurulması dinamikasına çevik reaksiya verən sistem kimi daxil oldu. Bu sistem daim özünü yeniləşdirir, meydana çıxan gözlənilməz vəziyyətlərə konstruktiv reaksiya verir. Azərbaycanın xarici siyasəti müasir dövr üçün xarakterik olan risk və böhranları nəzərə alan mexanizmlər formalaşdırır. Həmin mexanizmlər böhranlı situasiyalarda müxtəlif variantlardan ölkənin maraqlarına cavab verən daha səmərəli olanı seçməyə əsaslanır. Xarici siyasətin çevikliyi Azərbaycanı keçən müddət ərzində Cənubi Qafqazın lider dövləti səviyyəsinə yüksəldib. Ölkənin xarici siyasəti regional lider strategiyasına istiqamətləndiyindən bu mövqenin daha da möhkəmləndiriləcəyinə şübhə yoxdur.

Hal-hazırda Azərbaycan Cənubi Qafqaz regionunda sürətlə inkişaf edən, əlverişli geostrateji mövqeyə, mühüm infrastruktur layihələrini icra edən güclü iqtisadiyyata və orduya malik bir dövlətə çevrilmişdir. Həm beynəlxalq məsələlərlə, həm bölgələrimizin möhkəmləndirilməsi, o cümlədən işğaldan azad olunmuş torpaqlarımızın hərtərəfli bərpa edilməsi və siyasi-iqtisadi

islahatların dərinləşməsi, sosial siyasət, ordu quruculuğu ilə bağlı konkret proqramları olan, xalqın dəstəyini qazanan, Heydər Əliyev irsinə sadiq güclü hakimiyyəti var. Heydər Əliyevin əsasını qoyduğu Azərbaycan xarici siyasət strategiyası həm müstəqil demokratik dövlət quruculuğunu uğurla aparmağa, həm Cənubi Qafqazın aparıcı dövlətinə çevrilməyə, həm də regional lider olmağa imkan yaratdı.

## ƏDƏBİYYAT

**1.** *Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı.* https://e-qanun.az/framework/6693
**2.** *Heydər Əliyevin xarici siyasət kursu: dünya sisteminin yenidən qurulması kontekstində.*
https://news.milli.az/politics/183716.html
**3.** *"Global Firepower": Azərbaycan Ordusu tank, reaktiv yaylım atəş sistemi və özüyeriyən artilleriya qurğularının sayına görə dünyada 30-cu yerdədir.*
https://fed.az/az/dovlet/global-firepower-quotazerbaycan-ordusu-tank-reaktiv-yaylim-ates-sistemi-ve-ozuyeriyen-artilleriya-qurgularinin-sayina-gore-dunyada-30-cu-yerdedirquot-150947
**4.** *Heydər Əliyev və xarici siyasətin Azərbaycan modeli.* Xalq qəzeti, 2010. 9 may. s.5-6

## Гейдар Алиев и формирование внешней политики современной Азербайджанской Республики

**Зумруд Меликова***

**Абстракт.** В статье исследованы влияние деятельности Гейдара Алиева на формирование внешней политики современной Азербайджанской Республики.

В статье отражены проблемы, возникшие после приобретения Азербайджаном независимости, а также вопросы построения государственности и армии, определение внешнеполитических приоритетов, которые пришлось решать после прихода к власти Гейдару Алиеву, в период войны с Арменией. Кроме перечисленных задач в статье привлечены к расследованию роль Гейдара Алиева в

* доктор философии по политическим наукам,
доцент "Кафедры Международные Отношения" Бакинского Славянского Университета; Баку, Азербайджан
E-mail: zumrud.melik@gmail.com
https://orcid.org/0000-0001-5943-0441
**Цитировать статью:** Меликова, З. [2023]. Гейдар Алиев и формирование внешней политики современной Азербайджанской Республики. *Журнал «Metafizika», 6(1),* с.121-131.

**История статьи:**
*Статья поступила в редакцию: 13.01.2023*
*Отправлена на доработку: 10.02.2023*
*Принята для печати: 13.03.2023*

формировании отношений сотрудничества в двустороннем и многостороннем форматах и основные направления внешней политики современной Азербайджанской республики.

**Ключевые слова:** Азербайджанская Республика, внешняя политика, политика “мягкой силы”, политические реформы

## Heydar Aliyev and the formation of the foreign policy of the modern Republic of Azerbaijan

**Zumrud Melikova***

**Abstract.** The article’s name is “Heydar Aliyev and the formation of the foreign policy of the modern Republic of Azerbaijan”. In the article have been dealt the problems that Azerbaijan has encountered after gaining independence, state affairs and army-building issues in the war with Armenia after Heydar Aliyev came to power and determination of foreign policy priorities. The main directions of the foreign policy of the modern Republic of Azerbaijan, the role of Heydar Aliyev in the formation of cooperative relations in bilateral and multilateral formats have been researched.

**Keywords:** Republic of Azerbaijan, foreign policy, “soft power” policy, political reforms

### REFERENCES

**1.** *Constitutional Act on state independence of the Republic of Azerbaijan.* https://e-ganun.az/framework/6693

**2.** *Heydar Aliyev's foreign policy course: in the context of reconstruction of the world system.* https://news.milli.az/politics/183716.html

**3.** *“Global Firepower”: The Azerbaijani Army ranks 30th in the world in terms of the number of tanks, rocket launchers and self-propelled artillery units.* https://fed.az/az/dovlet/global-firepower-quotazerbaycan-ordusu-tank-reaktiv-yaylim-ates-sistemi-ve-ozuyeriyen-artilleriya-gurgularinin-sayina-gore-dunyada-cu-yerdedir-30-cu-yerde- 150947

**4.** *Heydar Aliyev and the Azerbaijani model of foreign policy.* People's newspaper, 2010. May 9. pp. 5-6

---

* Doctor of philosophy in political science,
Associate Professor of “Department of International Relations” Baku Slavic University; Baku Azerbaijan
E-mail: zumrud.melik@gmail.com
https://orcid.org/0000-0001-5943-0441

**To cite this article:** Melikova, Z. [2023] Heydar Aliyev and the formation of the foreign policy of the modern Republic of Azerbaijan. *“Metafizika” journal, 6(1),* pp.121-131.

**Article history:**
*Received: 13.01.2023*
*Accepted: 13.03.2023*